etmək, təbiətlə əlaqədə olaraq estetik zövq almaq, etik qaydalara, təbiətə, kollektivə qayğıkeş münasibət bəsləmək - hansı ki, bunlarsız bilikləri dərk etmək, mənəviyyatı, əqidəni, dünyagörüşünü formalaşdırmaq olmaz. Dərsin bu qaydada təşkili şagirdləri müşahidə aparmağa, müstəqil fikir yürütməyə istiqamətləndirir. İnsan təbiətin ayrılmaz bir hissəsidir. İnsanın təbiətə mənfi, qeyri - normal münasibəti onun özünə də fiziki, mənəvi cəhətdən dağıdıcı təsir göstərir.

Hələ ötən əsrin ikinci yarısında akademik M.Mehdizadə bu problemi nəzərdə tutaraq yazırdı: “Şagirdlərin idrak fəallığını formalaşdırmaq”- “idrak fəaliyyətini aktivləşdirmək” adı altında sovet didaktikasında bu problem çoxdandır ki, mərkəzi yerlərdən birini tutur.

Biologiya fənninin ümumi orta və tam orta təhsil pillələrində tədrisi nəzərdə tutulur. Şagird ümumi orta təhsil pilləsində canlılar aləmini öyrənməklə daha dolğun bilik və bacarıqlara yiyələnir. Tam orta təhsil pilləsində isə artıq həyata hazırlanan şagird təbiətin ayrılmaz hissəsi olan canlılar aləmini və özünü dərk etmiş olur. Biologiya fənninin məqsədi şagirdlərə canlılara dair zəruri bilik və bacarıqlar mənimsətməklə onlarda ekoloji mədəniyyət, estetik zövq, humanist və vətənpərvərlik keyfiyyətləri formalaşdırmaqdan ibarətdir. Bu məqsədin həyata keçirilməsi üçün:biologiya dərsərində STEAM modelindən istifadə etməlidir.

Fəal – interaktiv təlimdə müəllim bilikləri ötürən deyil, Fasilitator vəzifəsini öz üzərinə götürür. İnteraktiv təlimdə şagirdlərin təfəkkürünü hər hansı bir problemin həlli üçün fəallaşdırmaq və düşünməyə sövq etmək əsas məqsəddir. Birgə fəaliyyət, əməkdaşlıq şəraitində müəllim və şagirdlərin düşüncələri qarşılıqlı şəkildə müzakirə edilir. Bu zaman təlim subyekt-subyekt xarakteri daşıyır. İnteraktiv təlim də müəllimin qarşısına yüksək tələblər qoyur. Şagirdləri tədqiqata, diskussiyaya cəlb etmək, müstəqil fikir yürütməyi öyrətmək, onlara müəyyən biliklər toplusunu mənimsətməkdən daha çətindir. Müəllim dərs zamanı bütün qərarları özü qəbul etməli deyil, müəyyən məsələləri şagirdlərin mühakiməsinə buraxmalıdır. Bu yolla qazanılan biliklər şagirdlərin yaddaşında uzun müddət qalır və onlar həmin bilikləri praktikada tətbiq etmək bacarığına malik olurlar. Biz müəllim olaraq şagirdləri zehni əməyə sövq etməliyik. Atalar boş yerə deməyib: “İş insanın cövhəridir”. Şagirdlər öz ağlının, öz bilik və bacarıqlarının sayəsində əldə etdiyi bilikləri daha tez mənimsəyəcək və gələcəkdə də həyatda həmin biliklərdən səmərəli şəkildə istifadə edəcəklər.

Biologiya dərslərində informasiya texnologiyalarından istifadə müəllimə bir sıra imkanlar yaradır. Bunlardan təlim-tərbiyə prosesinin gedişində şagirdlərin şüurlu fəaliyyətinin təşkil edilməsi, təlim prosesində fərdi yanaşma üsulunun tətbiqinə daha böyük imkanlar yaradılması və qısa vaxt ərzində mikro və makro aləmdə baş verən hadisə və prosesi ardıcıllıqla izləmək imkanlarının yaradılmasını misal göstərmək olar. Bu texnoloji yeniliklərin hamısnı özündə birləşdirən,ən əsas yeni model STEAM tədris modelidir.

STEAM təhsil modeli tələbələrə 5 spesifik sahənin Elm (Science), Texnologiya (Technology), Mühəndislik (Energineering), İncəsənət (Art), Riyaziyyat (Math) birgə və inteqrqsiya olunmuş şəkildə tədris etmək ideyası əsasında qurulub.

Bioloq Cudit Ramili tərəfindən STEM olaraq, sonralar is incsənət Art əlavə olunaraq STEAM modeli oldu. STEM –də elmi anlayışlara daha çox üstünlük verilir. STEAM-da isə elmi anlayışlar araşdırılır, lakin bunu yaradıcılıq prosesində istifadə edilən sorğu və problemə həll etməyə əsaslanan təlim metodları vasitəsilə edir. Müasir təhsil sistemində STEAM-modeli fənlərin ayrı-ayrılıqda deyil, inteqrasiyalı tədrisin nəzərdə tutan təhsil sisteminə, metoduna verilən addır.




Şəkil 1. Steam modelinin açıqlaması

Biologiya dərslərində STEAM-dan istifadə edərkən dərsin mərhələləri əvvəlcədən aydınlaşdırılmalıdır. Bununla yanaşı bioloji biliklərin şagirdlərin həyat və fəaliyyətində mühüm rol oynadığını da nəzərdə saxlamaq lazımdır. Məhz bioloji təhsil sayəsində hələ yeniyetməlik yaşlarından şagirdlərdə özünə, ətrafdakılara, ümumiyyətlə, bütün canlılara qarşı diqqətli və ehtiyatlı yanaşma, təbiətə məhəbbət hissi formalaşır. Şagird müəyyən dərəcədə öz sağlamlığının qeydinə qalmağın nə dərəcədə mühüm olduğunu anlayır, öz orqanizminin quruluşun və funksiyalarını bilir, ekologiyanın nə demək olduğunu anladığına görə onda bitki və heyvanlar aləminə qarşı rəğbət hissi yaranır. Məktəbdə işlədiyim müddət ərzində belə bir fikrə gəlmişəm ki, yaxşı nəticə əldə etmək üçün hər bir müəllim öz fənninə marağı artırmalı, bunun üçün isə dərs zamanı müasir-pedaqoji üsullardan, o cümlədən informasiya-kommunikasiya texnologiyalarından istifadə etməlidir. İKT-dən biologiya dərsində istifadə tədris edilən fənnin keyfiyyətini də artırmağa kömək edir, müxtəlif obyektlərin nümayişini asanlaşdırır. Biologiyanın məktəbdə tədrisi mütəmadi olaraq təcrübələrin nümayişinə əsaslanır. Bununla belə, müasir məktəbdə təcrubələrin aparılması vaxt məhdudiyyəti üzündən çətindir. Hətta hər cür şəraiti olan, müasir avadanlıqlarla təchiz edilmiş laborator kabinetlərdə belə real təcrübələrin aparılması müəyyən vaxt tələb edir. Bir çox bioloji proseslər öz mürəkkəbliyi ilə fərqlənir. Obrazlı yaddaşa malik olan şagirdlər üçün abstrakt, şəkilsiz prosesləri öyrənmək çətinlik yaradır. Bu gün apardığım müşahidələr onu deməyə əsas verir ki, məhz bu problemlərin həll olunması üçün, İnternet resurslarından tədris prossesində aktiv istifadəyə nail olunması üçün STEAM nin köməkliyi ilə Biologiya fənninin tədrisi layihəsini irəli sürürük. STEAM layihəsini irəli sürməkdə məqsədim:

- Məktəbin pedaqoji və inzibatiidarəheyətini STEAM istiqaməti üzrə bilik və bacarıqlarının artırılması
- Məktəbdə təhsilin keyfiyyətinə və əyanilik, praktik dərs üsuluna keçirilməsi
- Yeni informasiya mədəniyyətinin formalaşdırımaq,
- Şagirdlərin biologiya fənni üzrə keçirilən yerli və beynəlxaq fənn olimpiadalarına hazırlaşmasına köməklik etmək məqsədi ilə yeni XXI əsr Azərbaycan müəllimini hazırlamaq və onu daima inkişafı üçün yardım etmək və istiqamətlər verməkdir.

STEM məzmunlu fəaliyyətlərə cəlbilməsi prossesi, STEAM müəllimlərinin həyataında böyük texnoloji yeniliklərə gətirib çıxardacaq. STEAM təlim texnologiyasının yeni təhsil proqramına inteqrasiya edilməsi respublikanın təhsilverən və təhsilalanlarında 21-ci əsr bacarıqlarının formalaşdırılmasının əhəmiyyyəti istiqamətində maarifləndirməkdir.

Biologiya müəllimlərinin bilik və bacarıqlarının artırılmasına və onların beynəlxalq olimpiada və yarışlara o cümlədən konfranslara qatılmasna böyük bir motivasiya yaratmış olacaq.

Ənənəvi savadlılıq və rəqəmsal təhsil göstəriciləri çox vacib olsa da, cəmiyyət tələbələrdən müasir dünyada çiçəklənməsi üçün vahid bacarıqlara sahib olmağı tələb edir. Bunlara yaradıcı, texnoloji, innovativ və kişilərarası bacarıqlar daxildir. Bu gün bu bacarıq və bilikləri əvvəlkindən daha əlçatan, fərdiləşdirilmiş və aktiv şəkildə əldə etmək lazımdır. Bu göstərilən bacarıqlar və imkanları STEAM yönümlü təhsil vermiş olacaqdır.

Beynəlxalq və Respublika səviyyəli layihələrin hazırlanması qaydaları,fəal və interaktiv təlim metodları və biologiya dərslərində onların tətbiqi imkanları, fəal təlimmetodları ilə dərsin mərhələləri, biologiya dərslərində oyun elementlərindən istifadə, biologiya dərslərində fənndaxili və fənlərarası inteqrasiya, şagird nailiyyətlərinin qiymətləndirilməsi, biologiyanın tədrisində fəal dərs nümunələrindən VI-XI siniflər üzrə, sonda biologiya dərslərində tərbiyəvi vəzifələrin həyata keçirilməsi imkan və yollarının tanıdılmasını öyrənmiş olacaqlar.

Orta məktəblərdə biologiya fənninin tədrisində STEAM modeli yanaşmasında modellərin hazırlanması, fikir və ideyalarının həyata keçirilməsi, ekspertlərin və təcrübələrin aparılması nəticəsində hazırlanmış hər hansı bir məhsullar şagirdlərdə həvəs oyadır və keçilən dərsin şagirdin yaddaşında ömürlük həkk olur. Bu təlim metodu yaradıcı şagirdləri üzə çıxarır və onların inkişafına stimul verir.

STEAM modeli bizlərə məlumdur ki, xarici ölkə modelidir. STEAM modelini həyata keçirmək üçün Beynəlxalq təcrübələrə əsaslanaraq dərsi qurmaq lazımdır. STEAM modelinin bir üstünlüyüdə ondan ibarətdir ki, həm müəllim həm də şagirdlərin birgə fəaliyyətinəticəsində yeni bir model hazırlanır. STEAM model dərslərin sayəsində dizaynerləri, texnikləri bir arada birləşdirir.

STEAM-layihədə xüsusilə yüksək qabiliyyətə malik müəllimlərin imkanlarından istifadə etmək əsas məqsədlərimizdən biri hesab edirik. Gələcəkdə onların vasitəsilə əlavə tədbirlərin təşkil olunmasında yaxından iştirak etmək, gənc nəslin biologiya fənninə marağın artırılması əsas ideyamızdır. Eyni zamanda layihədə iştirak etmiş və sonrakı illərdə məktəblərdə işləyən müəllimlərin Beynəlxalq və Respublika turlarında, yiyələndikləri intellektual imkanlarını sərgiləməklə layihənin davamlılığını təmin edəcəklər.

STEAM vasitəsilə biologiyanı öyrənmək təhsildə və uşaqları gələcək problem və imkanlara hazırlamaqda mühüm rol oynayacaq.

Təhsil müəssisələrində və bu gün ehtiyac duyulan sürətli öyrənmə bacarıqlarını inkişaf etdirəcək.

Ənənəvi savadlılıq və rəqəmsal təhsil göstəriciləri çox vacib olsa da, cəmiyyət tələbələrdən müasir dünyada çiçəklənməsi üçün vahid bacarıqlara sahib olmağı tələb edir. Bunlara yaradıcı, texnoloji, innovativ və kişilərarası bacarıqlar daxildir. Bugün bu bacarıq və bilikləri əvvəlkindən daha əlçatan, fərdiləşdirilmiş və aktiv şəkildə əldə etmək lazımdır. Bu göstərilən bacarıqlar və imkanları STEAM yönümlü təhsil vermiş olacaqdır.

## Nəticə

Yekun olaraq göstərək ki, ümumtəhsil məktəblərində şagirdlərin təlim fənləri üzrə əldə etdikləri bilik, bacarıq və vərdişlər yetişən nəslin müxtəlif elm sahələri üzrə anlayış və qanunauyğunluqlar haqqında zehni səviyyəsini formalaşdırmaqla məhdudlaşmır. Bilik faktlar, hadisələr, rəqəmlər yığımı deyil. O, insanda dünyagörüşü, ətraf aləmə, insanlara, cəmiyyətə, özünə müəyyən normalar daxilində münasibət formalaşdırır, mənəvi simanı traktovka etmək imkanına malikdir. Məktəbdə öyrədilən digər fənlər kimi biologiya dərsləri də şagirdlərin intellektual səviyyəsini və mənəvi simasını formalaşdırmaq funksiyasını yerinə yetirir. Belə bir yüksək məzmun keyfiyyətlərinə - bilik və mənəvi tərbiyə imkanlarına malik biologiyanın bütün bölmələrinin pedaqoji əsaslarını üzə çıxarmaq, təcrübi işdə ondan istifadə etmək yetişən nəslin insan, vətəndaş kimi formalaşması məqsədinə əhəmiyyətli dərəcədə təsir göstərə bilər.

## References

1. Concept of general education in the Republic of Azerbaijan (National Curriculum). "The Azerbaijani School" journal, 2006, №.2
2. Concept of assessment in the general education system of the Republic of Azerbaijan. Baku, "Curriculum" journal, 2009, №2, pp. 138-150.
3. State standards of general secondary education in the Republic of Azerbaijan. Educational policy in Azerbaijan (1998-2004). Volume I. Baku, "Chashyoghlu", 2005
4. Education Reform Program of the Republic of Azerbaijan. Educational policy in Azerbaijan (1998-2004). Volume I. Baku, "Chashyoghlu", 2005
5. Budagov B.A. Nature of Soviet Azerbaijan.Baku: Maarif, 1988,
6. Cavadov I. Monitoring and evaluation of the quality of education: modern approaches. 2011
7. Mardanov M.J. Today and tomorrow of Azerbaijan education. Baku, 2012
8. Alguliyev R., Mahmudova R. The role of the information revolution in the evolution of the education. Baku, 2016
9. Conference materials on "Globalization in Education and ICT ". Baku 2008, pp.7-9.
10. Gasimova L.N. From the experience of educating schoolchildren on the basis of national and moral values. Baku: 2004,
11. Mehdizadeh M.M. Ways to improve the educational process in secondary schools. Baku: Maarif, 1982, 383 p.
12. Aliyev F.J. Practicum of biology teaching methodology. Educational resource. Baku: ASPI publication, 1976, 145 p.
13. Huseynov A.M. Theoretical and methodological bases of teaching biology in secondary school. Baku: Chashyoghlu, 2000, 268 p.
14. Huseynov A.M., Guliyev P.I. General methodology of teaching natural sciences. Baku: ASPU, 2001, 176 p.

**Rəyçi: dos. C.Təlai**

Göndərilib: 01.10.2021: Qəbul edilib: 20.10.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/71/52-58

**Aygün Paşa qızı Əliyeva**
Bakı Slavyan Universiteti
dissertant
aliyeva.aygun2017@list.ru

# BƏDİİ YARADICILIQDA ŞÜURSUZLUQ PROBLEMİ

***Açar sözlər:*** *instinktlər, təzadlı hisslər, meyllər, sevgi, dərkolunmayan motivlər*

## The problem of the unconscions mental in artistic creation

**Summary**

The article "The problem of the unconscious mental in artistic creation" is devoted to the analysis of the unconscious in artistic creation. The study of artistic creation is scientifically necessary both from the point of view of consciousness and from the point of view of the unconscious. The unconscious is one of the urgent, but insufficiently studied problems. The article describes the elements of the unconscious, with the help of which the author conducts a psychological analysis.
***Key words:*** *instincts, conflicting feelings, inclinations, love, unconscious motives*

## Giriş

İnsan davranışı, hərəkətləri birbaşa insan psixikasının şüursuz prosesləri ilə əlaqəlidir.

Sosial varlığa çevrilən insan bioloji və psixoloji fərdiliyini itirmir və fərdiyyət insanın bütün fəaliyyətinə təsir göstərərək, özünü bütün sosial fəaliyyətlərdə göstərir. Qeyd etmək lazımdır ki, bu hərəkətlər bədii yaradıcılıqda yaxşı əks olunur və bədii yaradıcılığın öyrənilməsi həm şüurun, həm də şüursuzluğun psixoloji xüsusiyyətlərinin öyrənilməsi üçün zərurət yaradır.

Şüursuzluq psixologiyanın ən aktual, lakin yetərincə öyrənilməmiş sahələrindən biridir. Bu problem yalnız psixoloqlar üçün deyil, eyni zamanda filosoflar, sosioloqlar, ədəbiyyatşünaslar və digər sahələr üçün də böyük maraq doğurur. Şüursuzluq ətrafında müzakirələrin hələ də davam etməsi bunun köhnə problemlərdən olmasının göstəricisidir. Şüursuzluğun öyrənilməsi şüurun və bütövlükdə psixikanın mahiyyətinin müəyyənləşdirilməsinə və beyni tədqiq edən elmlərin inkişafına kömək edir. Praktiki olaraq bu məsələ, elmi və bədii yaradıcılıq problemi ilə yanaşı, şüurla şüursuzluq arasındakı vasitə problemi ilə də əlaqəlidir.

Bədii yaradıcılıq sənət yaratmaq prosesidir, bu və ya digər dərəcədə yenidir, eləcə də özündə yenililikçilik komponentlərini ehtiva edir. Ümumi psixologiya bir çox elmlər kimi, sənət əsəri yaratmaq prosesini də öyrənir. Bundan başqa ümumi psixologiya incəsənətə şəxsi yanaşma baxımından da yanaşır. Hər hansı bir rəssamın əsəri yaratma prosesi özü şüursuz prosesdir. L.Vıqotski qeyd edirdi ki, "İncəsənət şüursuz bir problemdir, şüursuzluğun sosial həlli-incəsənət ən çox ehtimal olunan cavabdır" (1, 113). Bu iki aspektdən özünü göstərir. İlk növbədə bədii yaradıcılıq prosesi zamanı psixi hallar, proseslər qoşulur. Bədii yaradıcılıqda fərdi yanaşma, konkret fərdlər kontekstində nəzərdən keçirilməli və fərdin sənətkarlıq yaradıcılığının öyrənilməsini əhatə etməlidir. Həmçinin də fərdi yanaşma, sənətkarın həyatının bütün mərhələlərində bioqrafiyası və şəxsiyyətin formalaşması kimi müstəqil bir tədqiqat sahəsini öyrənir. Bədii yaradıcılığın kökləri "irrasionallığa", aktiv şüursuzluğun qanunauyğunluğuna dayanır.

Davamlı olaraq rəssam tərəfindən ərsəyə gətirilən "bədii qərarlar"ın motivləri hər zaman onun şüurunda mövcud olmur. Bu qüvvələr rəssamın əsərlərindəki münasibətləri əks etdirmə qabiliyyətini təmin edir. Bəşəriyyət tarixi inkişaf etsə də incəsənətin və mədəniyyətin əsas dəyişməz gücünü dəyişmir. K.Yunqa görə: "Yaradıcılıq prosesi, ümumiyyətlə izləyə bildiyimiz qədər, arxetipin şüursuz ruhlandırılmasında , sənət əsərinin tamlığına qədər onun açılmasında, plastikdi.

Bədii yaradıcılıq prosesinin təhlili və şüursuzluğun təzahürü məşhur psixoloq, psixiatr Z.Freydin əsərlərində öz əksini tapmışdır. Şüursuzluq psixikasının ideyaları Z.Freydin adı ilə də

bağlıdır, bundan əlavə psixoanalitikin istiqaməti yalnız mütəxəssislər - psixoloqlar və psixiatrlar arasında deyil, həm yazıçılar və ədəbiyyatşünaslar, eləcə incəsənətin digər elmi anlayışlarında böyük uğur qazanmışdır. Freyd yeni bir sahənin, psixoanalizin yaradıcısıdır və bu sahədə böyük uğurları vardır, eyni zamanda şüursuzluq nəzəriyyəsinin və analitik açıqlamanın banisidir. Bu beyin fəaliyyətinin xüsusi bir növü-mürəkkəb əqli fəaliyyətin şüursuz formalarının mövcudluğunu adi ilə tanınan dövrünün yeganə nəzəriyyəsi idi. Bu nəzəriyyə fəaliyyətin müəyyənləşdirilməsinə və onun təsirinə imkan verən yeganə nəzəriyyə idi. İnsan intellekti yalnız reallığı əks etdirmək üçün vasitə deyil, eyni zamanda şüursuz qüvvələri gizləmək üçün bir cihazdır.

Z.Freyd dağıdıcı, destruktiv instinkti insan davranışının hakim motivlərindən biri adlandırdı. Dağıdıcı instinkt insan davranışının hakim motividir. Bunlar, bir qayda olaraq, sosial normaların tələbləri ilə ziddiyyət nəticəsində şüura buraxılmayan, sıxışdırılma mexanizmi vasitəsilə mexanizmi vasitəsi ilə şüurdan uzaqlaşdırılır.

Müxtəlif emosional təcrübələr də insan psixikasında yoluxmuş bir mərkəz təşkil edir. Bu fokus müxtəlif qeydlərdə, səhv hərəkətlərdə, adların unudulmasında və s.-də özünü göstərir. Şüursuz psixika konsepsiyasının ilk dəfə XVIII əsrdə Leybnits tərəfindən formalaşdırıldığı məlumdur.

Elmi və klassik formada psixoanalizin əsası XIX sonu XX əsrin əvvəllərində Avstriyalı psixiatr və psixoloq Z.Freyd tərəfindən qoyulmuşdur. Psixoanalizin nəzəri münasibətləri, müddəaları, prinsipləri fərdi, şəxsi, mədəni və sosial hadisələri izah etmək üçün humanitar sahənin müxtəlif istiqamətlərində tətbiq olunmağa başladı.

Z.Freyd sayəsində psixoanaliz bir istiqamət olaraq həm elmi sahələr, həm də insanın ruhi aləmi ilə maraqlanan insanlar üçün maraqlı və əhəmiyyətli oldu. Bu problem K.Yunq, E.Adler, F.Uznadze, F.İbrahimbəyov, İ.Novruzlu kimi alimlər tərəfindən daha da araşdırılmışdır. Bədii yaradıcılıq psixoanalizin tədqiqatında xüsusi yer tutur.Bədii yaradıcılıq üzərində şüursuzluq problemini araşdırmalar bu günə qədər çox aktualdır.Fəlsəfi və psixoloji nəzəriyyələrdən bəhrələnib öz bədii əsərlərini yazan ədiblərdən biri də rus yazıçısı L.Tolstoydu.

İnsan həyatı yalnız görünən, hiss olunan tərəflərdən ibarət deyil. İnsanın əsas, görünməyən tərəfi onun müstəqil, azad və ölməz ruhudur. Bir insanın ruhi həyatı ağıl, hiss və iradənin məmnunluğundan ibarətdir. Ruh anlayışı insanda Uca Allah qorxusu, vicdanla təzahür edir. Hər bir inanclı insan üçün ruh rəhbər prinsip kimi xidmət edir. L.Tolstoya görə kitab oxuduqda və ya hər hansı bir rəsm əsərinin qavrayışında oxucunun ruhu yazıçı, sənətkarın ruhu ilə birləşir. Əgər sənət əsəri insanda müəllifin ruhu ilə birləşərək birlik hissi oyadırsa, bu yüksək sənətdir. Birlik, qavrayış ruhun sənətkar ruhu ilə birləşməsi, eləcə də sənətin cəlbedici tərəfi və gücüdür. Bu zaman sənətkarın "mən"i qavrayanın "məni" ilə birləşir.

Sevgi inanılmaz bir hiss, şəxsi xoşbəxtliyin təməlidir. Bu mürəkkəb hiss, bütün insanların xəyal etdiyi sevgi, yalnız seçilmişlər tərəfindən yaşanılan bir hissdir. Sevgi adına yaşayırlar, yaradırlar, həyatlarını qurban verirlər.

Fərqli mədəniyyətlərdə sevgi müxtəlif yollarla xarakterizə olunur. Qədim Hindistan filosofları sevgini üç cazibənin birləşməsi kimi xarakterizə edirdilər: dostluq yaradan ruh, hörmətə səbəb olan ağıl və istəyi doğuran bədən. Sevgi özündə nə qədər istəkləri birləşdirirsə, bir o qədər ziddiyyəti də əhatə edir. Sevgi özünəməxsus şəkildə insanın xarakterini, istiqamətini və mənəvi sərvətini əks etdirir. Bir çox filosoflarının utopik fikirlərindən biri sevginin hər şeyə qadir olması, bütün həyat ziddiyyətlərini həll etmə qabiliyyətinə malik olmasına inamdır. Sevginin yalnız bəşəriyyətə sevinc gətirən harmoniya olması fikri, sevgi anlayışında birtərəflilik göstərir. Qədim Çin filosofu və mütəfəkkiri Konfutsi sevgi haqqında üç fikir söyləmişdir: "kədər olmadan insansevərlik, xəyal qırıqlığı olmadan qazanılan bilik və qorxmadan cəsarət." (3, 87) Sevgi ilə birlikdə insanın həyatına ən dərin ağrılar və faciələr də daxil olur. Sevgidə çox şey təsadüflərdən asılı olur və bu səbəbdən də sevgi ən böyük risk hesab edilir.

Əgər insan şəxsi xoşbəxtliyini yalnız sevgidə görərsə, sonra qarşılaşdığı çətin həyat xəyal qırıqlığına çevrilə bilər. Sevgi xəyali bir hissdir, ona olan istəklər nə qədər çox olarsa, insan bir o qədər də ziddiyyətlə qarşılaşa bilər. O həyata çox bənzəyir, həyat kimi çoxşaxəli və ziddiyyətlidir. Sevginin təzahürü də çox yönlüdür. Sevgi hər cür dəyişikliklərdə, illüziyalarda, sentimentallıqda

özünü göstərir. Bu hiss şəxsiyyətin özünü xarakterizə edən, ifadə edən, insan fəaliyyətinin müxtəlif sahələrində və əlaqələrində özünü göstərir. Bu və ya digər növ sevgi özümüzün mümkün qədər yaxşı xüsusiyyətlərini aşkara çıxarır. Qərb mədəniyyətinə nəzər yetirsək sevgi dörd növə bölünür: libido -birinci növ, çoxalma arzusu və insanlar arasındakı münasibətlərin ən yüksək forması olan- Eros ikinci növdür. Dostluq, qardaş sevgisi-filiya üçüncü növdür.Dördüncü növ- Agape-karitas insanın yaxınına olan sevgi, onun rifahı naminə qayğı göstərmək, bu eyni zamanda Tanrının insana olan sevgisinin prototipidir.

Görkəmli Avstriyalı psixoloq, psixiatr Ziqmund Freyd sevginin instinkt olduğuna inanaraq, bütün insan həyatının iki instinkt təşkil etdiyini-sevgi və ölüm (Eros və Thanatos) müəyyənləşdirdiyini qeyd edirdi. Eros insan psixikasındakı ən güclü qüvvədir. İnsan inkişaf etsə də, sosial institutlarını inkişaf etdirsə də, heyvani hisslərdən ona miras qalan cinsi enerji dəyişmir və mahiyyət etibarilə sevgi ibtidai dövrlərədə olduğu kimi qalır. Freydə görə, instinktə əsaslanan sevgi insan mədəniyyətinin əsasını təşkil edir. Bu hiss insanı digərinə bağlayır, ailələri, qəbilələri, xalqları, millətləri bütövlükdə insanlığı birləşdirir.

Sevgi şəxsiyyətin özünütəsdiqi və özününkarıdır. Başqa bir insanı hiss etmək, onu daha dərindən anlamaq üçün insan özünü inkar etməyi, başqasında özünü təsdiq etməyi bacarmalıdır. İnsan özünü başqa bir insana həsr etməkdən qorxmamalıdır, əks halda sevgi qarşısında qorxusu olacaqdır. Hər şeydən əvvəl sevgi ondan geniş istifadə etmək deməkdir. Birinə sevgi vermək insana böyük sevinc bəxş edir, insanın canlılığına dəlalət edir. Z.Freyd qeyd edirdi ki, "...Bu prosesdə nə isə doğulur və prosesə cəlb edilən hər iki insan həyata minnətdar olur, bu hiss onları yaşadır" (4, 163) Lakin özünü yalnız sevgiyə həsr etmək zənginləşmək demək deyil. Müğənni auditoriyasından ilham alır, aktyor tamaşaçılarından, müəllim şagirdlərindən. Təbii ki, sevgi vermək və tamamilə sevmək insanın xarakterindən asılıdır. Sevgidə həmişə sevgi obyekti üçün maraq, qayğı olmalıdır. Sevgi həm insanlara, həm də heyvanlara qarşı hərəkətlərdə özünü göstərir. İnsana maraq göstərmədən sevgi haqqında çox danışmaq olar, lakin o zaman bu cür sevgi inandırıcı olmur. Belə olduğu təqdirdə sözlər hərəkətlərlə müşayiət olunmalı, maraq və qayğı hörmətə, məsuliyyət isə azadlığa səbəb olmalıdır. Bunlar sevginin tərkib hissələridir. Və görünən budur ki, bu komponentlər haqqında məlumat bizə sevgi qapılarını açmağa açar verir, amma sevginin mahiyyətini açmaq o qədər də asan deyil.

Sevgi şüur üçün anlaşılmaz bir fenomendir, bəlkə onun cazibəsi misilsizliyində və müstəsnalığındadır? Bəlkə bildiklərimizdən çox xəyallarda daha çox həqiqət var? Sevgini araşdıran Volter möcüzələrin biz onları anladığımız anda yoxa çıxdığını qeyd edir. Sevgidə hər şey fərdi olur. Həm sevginin, həm məhəbbətin gücü, həm də sevginin müddəti insanın xarakterindən asılıdır və xarakter şəxsiyyətin fərdi xüsusiyyətidir. Sevgidən yalnız xoş fürsətləri gözləmək və yalnız ən az müqavimətli yollardan getmək hər şeydən öncə özümüzə ciddi zərər verə bilər. Qəlbin dərinliklərində asan əldə olan şeyi qorunmaq mümkün olmur. Belə çoxsaylı süni qələbələr şəxsiyyətin çökməsinə, tənəzzülünə səbəb ola bilər. Sevginin gücü özünüzə qalib gəlmək bacarığındadır. Əlbətdə bu o demək deyil ki, sevgi yolunda qəsdən müxtəlif maneələr qoymaq lazımdır. Şəxsiyyətdən çox şey tələb edən sevgi stereotipləri və qərəzləri məhv etməklə böyük işlər görür. Müxtəlif müşahidələrin təsdiq etdiyi kimi, güclü bir xarakterə malik olan insanların sevgisi daha dərin şəkildə ifadə olunur. E.Fromm "Sevgi sənəti" adlı əsərində qeyd edirdu: "Bu sənətə yiyələnmək üçün nizam-intizamlı, diqqətli, səbrli, marağını ifadə edə bilmək, obyektiv, cəsarətli, şən və s. qabiliyyətlərə ehtiyac vardır" (5, 177) E.Fromm sevgini xarakterin xüsusiyyəti hesab edir və yuxarıda qeyd edildiyi kimi xarakter həyat təcrübəsində qazanılmış fərdi xüsusiyyətlərin məcmusudur. Və sevgi bu fərdi və şəxsi xüsusiyyətlərinin gücləndiricisidir. Bir çox insan üçün öz "mən"i iki "mən" tarazılığından daha vacibdir, çünki insan fərdi nə qədər güclü ifadə olunmuş olsa , parlaq şəxsiyyət olsa, bir o qədər özünə yaxın münasibət qurmağa insan tapmaq çətin olur. Ancaq bu fikrə müxtəlif yanaşmalar mövcuddur. Parlaq fərdiyyət həm də parlaq, qeyri-adi sevgiyə qadirdir; lakin bunu əksi olduqda insa dramatik vəziyyətlərə, sığortalanmadığı münasibətlərə düşə bilər.

Sevgi insana dəyərləri dərk etməyə kömək edir, həyat üçün lazım olan özünə hörməti hissini artırır və ruhun katarsisi olan, özünə qapanmaqdan, monoton həyatla məhdudlaşmamaqdan onu

qoruyur. Ancaq bundan başqa qeyd etmək lazımdır ki, sevgi insanı həyat dramatizmindən qoruya bilmir, üstəlik bir çox hallarda onu daha da gücləndirir, insana öz qəlb ağrısını daha kəskin hiss etdirir.

Çox vaxt insanlara kor məhəbbətdən xəbərdarlıq edilir, ümumiyyətlə bu korluq məhdud, zəif xarakterli, dar dünyagörüşlü insanlar üçün xarakterikdir. Bundan başqa ehtiraslı, laqeyd, müşahidəçinin "obyektivliyindən" daha kəskin olan korluq da mövcuddur. Sevgi həm də bir növ korluqdur, çünki bu hiss insanı ətrafdakı hər şeyə eyni dərəcədə diqqətli olma qabiliyyətini itirməsinə səbəb olur. Sevgi insanın yeni dəyərlər dünyasını işıqlandırır.

Həyatın ümumi məzmunundan qoparılan sevgi insanda kor eşq hissini formalaşdırır. Gərginlik şəraitndə olan sevgi xəstəliyə bərabər tutulur, lakin bilinən bütün xəstəliklərin ən yaxşısı və ən mükəmməli, sağlamlıqdan belə daha çox qiymətliyə çevrilir. Eyni zamanda sevginin özü şəxsiyyəti formalaşdıran ziddiyyətlər kompleksinə daxil edilmişdir. Bu münasibət həm sərbəst, həm müstəqillik, həm asılılıq, itki və qazanc gətirən məhdudlaşdırıcı bir münasibətdir. Belə ki, bu hiss bir-birinə uyğun olmayan şeyləri birləşdirərək: təməl və təzad, həyat və ölüm, bilinən və bilinməyən xoşbəxtliyin əsasını təşkil edir.

Elmi və nəzəri cəhətdən mənəvi və cismani sevgi münasibətləri problemi bir çox tədqiqatçıların diqqətini çəkir. Bu problem həm dünya ədəbiyyatında, həm də yerli ədəbiyyatda hərtərəfli araşdırılmamışdır. L.Tolstoyun əsərləri indiyə qədər əsasən fəlsəfi və ədəbi cəhətdən tədqiq edilmişdir.

Onun əsərlərinin psixoloji tərəfi dövrümüzdə bir çox gənc tədqiqatçılar üçün maraq kəsb edir və humanitar elmlər arasında böyük populyarlıq qazanmışdır. Lakin L.Tolstoyun əsərlərinin intim-həssas tərəfi bir çox tədqiqatçılar tərəfindən psixoloji tədqiqat baxımından araşdılacaq mövzu kimi qəbul edilmir. Buna görə, müasir tolstoyşunasların tədqiqatlarında belə L.Tolstoyun əsərlərinin əsas personajlarının sevgi-intim münasibətlərinin öyrənilməsində hələ də boşluqlar vardır.

Bütün fəzilətlərin və ən yüksək fəzilətin əsası olaraq yaxın bir insana sevgi hər bir insanın ruhuna xas olan bir hissdir. Tolstoyun "Dirilmə" romanı fərdin ictimai həyatı, daxili vəziyyəti, zamanı, insanın ömrünün günlərini, saatlarını, dəqiqələrini incəliklə, məharətlə müqəddəsləşdirməsi oxucunu heyrətləndirir. Tolstoyun bir psixoloq kimi irəli sürdüyü fikirləri "daxildən" təqdis etmədən, şəxsiyyət və tarix arasındakı sirri, əlaqələri anlamaq mümkün deyil.

"Dirilmə" romanı üzərində on il işləyən yazıçı, psixologiya ilə bağlı son nəşrləri maraqla oxumuş, tez-tez fəlsəfə və psixologiyaya dair jurnalları nəzərdən keçirmişdir. Yazıçı, şüuru öyrənməyin vacibliyini qeyd edən V.Ceymsin "axın və ya çay" və "axar su" öçerkləri ilə yaxından tanış olmuşdur. V.Ceymsin əsərlərinin bir çox müddəaları ilə razılaşmasa da, onun düşüncələri Tolstoyun əsərlərindən yan keçməmişdir.

Yazıçının özünün də etiraf etdiyi kimi, psixoloji ədəbiyyatla tanışlıq onun üçün "ibrətamiz" idi, xüsusən də o, tədqiqatçılar arasında Qefdinq kitablarını daha çox sevmişdir.

Şüurla şüursuz zehni vəziyyət arasındakı əlaqəni öyrənən Qefdinq, "mistisizm yolu" nudan imtina etmişdir. Bu psixoloji düşüncəni L.N.Tolstoyda dəstəkləmişdir. Yazıçının gündəliyindəki qeydlər bunu sübut edir. Şüursuzluq sahəsi Tolstoyun böyük marağına səbəb olmuşdur.

İnsanların yıxılması və dirilməsi rəngarəng şəkildə L.Tolstoyun "Dirilmə" romanında təsvir edilmişdir. Əvvəlki əsərlərində olduğu kimi, sevgi məsələləri bu əsərədə də yalnız mənəvi mövqedən təsvir olunur. Qəhrəmanların sevgi münasibətləri isə ümumiyyətlə araşdırılmamışdır.

Sevgi problemi, insanın mənəvi cazibəsinin cismani cazibəsinə qarşı çıxması ilə ifadə olunur. Bu kontekstdə sevgi L.Tolstoyun sonrakı bədii yaradıcılığında açıq şəkildə ifadə olunur.

L.Tolstoyun "Dirilmə" romanındakı cismani düşmə və mənəvi dirçəliş səbəbləri romanın nəşrindən bəri həm ədəbiyyatşünasları, həm də psixoloqları maraqlandırır. Bu hərtərəfli araşdırma tədqiqatçılar üçün böyük maraq doğurur. Lev Tolstoyun yaradıcılığı ədəbi və psixoloji araşdırmalar üçün böyük bir xəzinədir. "Dirilmə" romanında cismani düşmənin səbəbləri və şəxsiyyətin mənəvi dirçəlişi həm ədəbi, həm də psixoloji cəhətdən böyük maraq doğurur. Daha öncə tədqiqatçıların diqqətini çəkməyən bu problem və motivlər L.Tolstoy yaradıcılığının tam şəkildə ortaya çıxması üçün gərəklidir.

Mənəvi eşq insanın bütövlüyü və daxili azadlığı üçün zəruri şərtdir, lakin mənəviyyatın olmaması daxili azadlığın, şəxsiyyəti faciəyə aparan, cismani sevginin ağrılı əzablarına tabe edən bir hissdir. Şəxsiyyətin cismani, təməl hisslərlə mübarizəsi "Dirilmə" romanında izlənilə müşahidə edilir, bu mübarizə yazıçının dini və əxlaqi inanclarına əsaslanaraq yaranır. Düşmə və mənəvi dirçəliş səhnələri, hiss mənzərələri, şübhəsiz ki, Tolstoy dünyasının bədii mənzərəsini daha parlaq, çoxşaxəli və daha maraqlı edir

Tolstoy əsas qəhrəmanların cismani impulslarını pozğunluq, şəhvət və əxlaqsızlıq kimi qiymətləndirir. Tolstoy üçün sevgi xristianlıq anlayışında yaxınına sevgi, eqoistlikdən uzaq olmaq, təmənnasız yaxşılıq etmək və heyvani hisslərdən uzaq olmaq deməkdir. Mənəvi sevgi insan dünyasının dühasıdır. Aşağı səviyyəli, həssas sevgi, istər-istəməz iztirablara səbəb olur.

Ruhani sevgi əzabın özünü yaxşılığa çevirməyə, insanı pis düşüncələrdən təmizləməyə qadirdir. 1988-ci ildə L.Tolstoyun qələmə aldığı "Həyat haqqında" adlı traktatında mənəvi sahənin maddi sahədən üstünlüyünu təsdiq qeyd etmişdir. Maddi sərvətləri tamamilə sıxışdırmış, onları son sıraya qoymuşdur.

Tolstoy ən maraqlı xarakteristika günaha vermişdir. Tolstoya görə günah, müxtəlif formalarda özünü göstərir. İnsanın mühitində bir çox cazibələr vardır ki bunlar: günahın "şeytani" cazibəsi, ehtiras cazibəsidir. Bu cazibələr insanın düşüncələrində və hərəkətlərində mövcuddur. Tolstoyun fikrincə, bu cazibə dini, əxlaqi, ictimai fikirlər və inanclar vasitəsilə aradan qaldırılmalıdır. Müəllif romanında personajlarının günaha batmasını bu mövqedən araşdırır. Əxlaqın köməyi ilə dini, əxlaqi ideyalar sayəsində qəhrəmanının ruhunu dirçəldir.

Daha sonra Tolstoy, bədii yaradıcılığın köməyi ilə öz həssaslığını, başqalarını xilas edən cismani cazibəni səylə aşır, özünü xilas edir. "Bu elə onun öz yaradıcılığıdır, tamamilə onunla birləşib, bütün niyyətləri və bütün bacarığı ilə ona qərq olub." (6, 221)

L.Tolstoyun əsərlərindəki sevgi həmişə müqayisəli xarakter daşımışdır. Onun əsərlərində iki növ sevgi mövcuddur: cismani və mənəvi. Əgər cismani sevgi mənəviyyatla əlaqələndirilirsə, ruhən müqəddəsləşdirilirsə, deməli, yaxşılığın daşıyıcısıdır, yox əgər ruhən müqəddəsləşdirilməyibsə, onda bu sevgi özündə pislik daşıyır.

"Dirilmə" romanı L.Tolstoyun inanc və prinsiplərinin canlı göstəricisidir. Romanda Tolstoy baş qəhrəman Katyuşa Maslovanın günaha batmasının və Dmitri Nexlyudovun mənəvi cahətdən dirilməsinin psixoloji tərəfini araşdırır. Romanın başlanğıcında Katyanın Nexlyudova olan sevgisi mənəvi xarakter daşıyır. Katya Nexlyudovla görüşəndə sevinc hissi keçirir, onun hissləri ən saf, ən məsum hisslərdir. İlk öpüşdən sonra isə hər şey dəyişir. Nexlyudovun cismani impulsları bu hisslərin bütün saflığını pozur. Münasibətlər mənəvi-hissi xüsusiyyətdən cismani-şəhvət xüsusiyyətinə keçir.

Bu roman etiraf xarakterlidir və romanda yazıçı öz psixologiyasını əsərə köçürür. Yazıçının böhranlı dövrlərində o dəyərləri yenidən qiymətləndirir və təlatümlü keçmişindən çox peşman olur. Günahkar keçmişinin düşüncələri onu tərk etmir, şüuraltı səviyyədə bütün təcrübə və düşüncələrini bu romana köçürür. Beləliklə, katarsis meydana gəlir, yazıçı ona zülm edən, həyatına müdaxilə göstərən hər şeydən azad olur. Yuxarıda qeyd edildiyi kimi, yazıçının gəncliyi çox fırtınalı, qadınlarla münasibətləri qarışıq olmuşdur. Belə bir psixoloji xarakterli roman yazaraq əslində o, əsas qəhrəmanı xilas etməklə özünü xilas edir.

Tolstoyun yaradıcılığında sevgi və təzahürünün bütün növləri ənənəvi idi. Tolstoy sevgisi 19-cu əsr şəxsiyyətinin əsas konsepsiyalarını özündə cəmləşdirdi. Bu dünyəvi, ailə xoşbəxtliyinin axtarışı idi. Bu sevgi rus klassik ədəbiyyatının bir çox əsərində öz əksini tapmışdır.

L.Tolstoyun dünyası çox qatlı və müxtəlifdir. Müasir dövrdə Tolstoyun əsərləri humanitar elmlərin müxtəlif aspektlərdə öyrənməsi üçün geniş material verir. "Anna Karenina" romanının təhlilində şüursuz ünsürlərin müəyyənləşdirilməsi kimi məqamlara maraq göstərilir. "Anna Karenina" romanı psixoloji, fəlsəfi, ədəbi və s. cəhətdən tədqiq edilmişdir. Romana çox sayda sosial, əxlaqi və psixoloji elmi əsər həsr edilmişdir. "Anna Karenina" romanındakı şüursuz psixika insan varlığının ən vacib formalarından biridir. Romanın səciyyəvi xüsusiyyətləri şüursuz konsepsiya, sabit semantik komplekslər kimi əhəmiyyətli bədii ifadələri özündə ehtiva edir.

"Anna Karenina" romanındakı şüursuz obrazlar L.Tolstoyun fikirləri ilə şərtləndirilmiş, əvvəlcədən zəruri, sistemli şəkildə formalaşdırılmışdır.

Şüursuzluq səviyyəsində yaşamaq və ölüm arzusu eynilik təşkil edir və eyni psixoloji mexanizmlə idarə olunur. Anna sakit, mülayim ailə həyatı yaşayarkən, ruhunda, daha doğrusu şüursuzluğunda, həyat instinkti ilə ölüm instinkti nisbi tarazlıq təşkil edirdi.

Həyatın şüursuz təsviri və şüursuz ölüm arzusu monoton həyat axını ilə tarazlaşırdı. Anna bu vəziyyətdə daha çox nəyi sevdiyini dəqiq deyə bilmirdi: həyatı, yoxsa ölümü? Həyatı həyəcan və ölümcül apatiya halları hiss olunmaz şəkildə bir -birini əvəz edirdi və bu həddlər arasındakı tərəddüd amplitudası böyük deyildi.

Vronskinin onun həyatına daxil olması ilə həyat hissi ilə ölüm hissi arasındakı dəyişiklik və mübarizə prosesi sürətlənir. Vronskiyə olan ehtiraslı sevgi çılğın bir hərəkətə gətirib çıxardı və yalnız həyat instinktini deyil, ölüm instinktini də gücləndirdi. Bu ikisi bir-birindən ayrılmazdır - ölüm və həyat. Onun həyata doğru sürətlə hərəkəti eyni şəkildə ölümə aparır.

Anna Kareninadakı şüursuz cəhətlərin bədii təsviri, Tolstoyun psixoloji analizinin formalarından biridir: romandakı şüursuz ünsürlər vasitəsi ilə ayrı-ayrı obrazların xarakteroloji müəyyənliyi vurğulanır.

Əvvəlcədən düşünmək, proqnozlar oxucunun sujeti qavraması üçün maraq yaradır, gələcək hadisələri dolayı şəkildə xarakterizə edir, romanın sonunu qabaqlayır və bununla da özündə süjet yaradan funksiya yerinə yetirir. Tolstoyun romanın sujet xəttində işıqlandırdığı müxtəlif qaranlıq səhnələr Anna və Vronski arasında bədbəxtlik, günah və intiqam hissini daha da gücləndirir. Onların əksinə Levin ilə Kiti arasındakı münasibətlər isə əlverişli yolla və xoşbəxtliklə həll olunur.

## Nəticə

L.Tolstoy, psixoloji ədəbiyyatla təfərrüatlı tanış olaraq, psixikanın quruluşu ilə, xüsusən də şüursuzluqla maraqlanırdı. Tolstoy həyatını uzun illər insan beynin gizli proseslərinin öyrənilməsinə həsr etmişdir və bunu tamamilə bacarmışdır. Tolstoyu haqlı olaraq klassik rus ədəbiyyatının ən yaxşı psixoloqu adlandırıldı.

Tolstoy insan psixikasındakı şüurlu və şüursuz, rasional və irrasional anlayışlarının mürəkkəb əlaqələrini təsvir etmək üçün spesifik formalarını, texnikasını işləyib hazırlamışdır.

Tolstoyun əsərlərində olan proqnozlar, əlverişli və əlverişsiz məqamların, zamanın və taleyin motivlərini təşkil edir. Burada "qədər" və "taleh" anlayışlarının mənaları fərqli göstəriıir: "taleh" sözünün mənası amansız qüvvələrin qaçılmaz müdaxiləsi anlamına gəlir.

L.Tolstoy öz əsərlərində təzadlı hisslərə, şuürsuz meyllərə, dərkolunmayan motivlərə müraciət edərək şüursuzluğun tədqiqatı üçün böyük material təqdim edib.Onun son əsərləri özlüyündə sevgi mövzusunu, xüsusən də Tanrıya olan sevgini təzahür edir. Sevgi və onun təzahürlərinin bütün növləri birbaşa insan, insan varlığı mövzusu ilə sıx əlaqəlidir. İnsana biososial varlıq olaraq insanlar fərqli bucaqlardan baxırlar. L.Tolstoy əsərləri özündə Tanrı sevgisini, həyatı dərk etməyi əks etdirir. Ömrünün son illərində Tolstoy cismani sevgiyə yalnız Xristianlıq nöqteyi-nəzərindən baxmışdır. Bir insan yalnız Allahı sevməklə ölümsüzlük qazanır. Cismani sevgi nəslin artırılması üçün bioloji bir ehtiyac, özünü qorumaq üçün bir instinktdir

Tolstoy, obrazın fərdiləşdirilməsinə kömək edən və süjet-kompozisiya funksiyasını yerinə yetirən xəyallara xüsusi əhəmiyyət verir. Qəhrəmanları şəxsiyyətə xas olan vacib emosional məzmununu əks etdirən xəyallar, peyğəmbərliklərin və əlamətlərin bütün əsas motivlərini və simvollarını özündə cəmləşdirir. O öz düşüncələrində, "talehin pisliyi"ni açıq şəkildə göstərir və onun fikrincə belə hallara müqavimət göstərmək mümkün deyil.

## References

1. Vygotsky L. Psychology of Art, Moscow, 1965, p113
2. Jung K. Analytical Psychology M.1998, p. 230
3. Sayings of Confucius, his disciples and other persons. St. Petersburg, 1911, p. 87
4. Freud Z. Essays on the Psychology of Sexuality. Moscow, 2008, p. 163

5. Fromm E. The Art of Love M. 1956, p. 177
6. Jung K. Analytical psychology M.1998, p. 221
7. Grodetskaya, A.G. Tradition answers: the lives of the saints in the spiritual search of Leo Tolstoy [Text] / A.G.Grodetskaya. - SPb: Nauka, 2000 - p. 119 -120
8. Nabiev N.G. Man in the world of Leo Tolstoy. -M.: Dialogue-MGU, 1999, p. 234
9. Fromm E. The Art of Love M. 1956, p. 23
10. Shmelev V.D. Philosophical and theological concepts of Leo Tolstoy // News of the Ural State University, 2004, No. 32, p. 154.

**Rəyçi: ps.f.d. S.Mansurova**

Göndərilib: 03.10.2021: Qəbul edilib: 19.10.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/71/59-63

**Aytən Ziyatxan qızı Əliyeva**
Azərbaycan Dillər Universiteti
müəllim
aytanaliyeva84@gmail.com

# İSPAN ƏDƏBİYYATINDA "ÖKÜZ" VƏ "TORERO" MƏFHUMLARI

***Açar sözlər:*** *tavromakiya terminləri, ədəbiyyat, öküz, torero, məfhum*

## The concept of "bull" and "bullfighter" in Spanish literature

**Summary**

The article reflects the views of Spanish writers and poets who are fans of bullfighting. The authors spoke about the importance of bullfighting in Spanish culture and literature. The works written about bullfighting are investigated. The article especially deals with the concepts of "bull" and "bullfighter" from the lexical units of bullfighting, widely used in Spanish literature. Based on examples from the authors, the place of the concepts of "bull" and "bullfighter" in Spanish thought is explored. In the works, the bull is metaphorically described as "wild", "strong", "dangerous", "quick", "brave". The characteristics of the bullfighters, such as "proud", "handsome", "brave", "winner", "professional person who earns good money", "famous" in Spanish thought, are also successfully reflected in the works of Spanish authors.

***Key words:*** *terms of bullfighting, literature, bull, bullfighter, concept*

XVI əsrdən başlayaraq bu günkü günümüzə qədər gəlib çatan, ispan ənənələrinin əsas rəmzi olan və ispan mədəniyyətinin əsas tərkib hissəsini təşkil edən "öküz döyüşünə (korridaya)" xas terminlər kəmiyyətcə çoxdur. Tavromakiyada istifadə olunan leksik vahidlər həqiqi, əsl leksik sərhədlərini aşaraq insanın hər hansısa fəaliyyətində və digər sahələrdə də emosionallıq və ekspressivliyi artırmaq, lazımi fikri lakonik, affektiv şəkildə çatdırmaq məqsədilə işlənmişdir. İspan dilində artıq orta əsrlərdən başlayaraq öküzlə bağlı öz əksini tapmış ifadələr demək olar ki, ədəbiyyatın bütün janrlarına sirayət etmiş və orada öz əksini tapmışdır.

Filosof Xose Orteqa i Qassetə görə İspaniya tarixini korridadan yan keçərək öyrənmək əbəsdir. (12) Orteqa i Qasset özünün "La caza y los toros" əsərində bu qədər səssiz keçən bir oyunun ətrafında bu dərəcədə böyük söz-söhbətin yaranmasına təəccüb etdiyini bildirir. Korridanın böyük həvəskarlarından biri olan və əsərlərində dönə-dönə bu bayramı təsvir edən Federiko Qarsiya Lorkanın fikrincə, "öküz döyüşü dünyanın ən valehedici mədəni bayramıdır". (13)

Antonio Maçadonun təbirincə desək, sonu ölümlə nəticələnirsə, demək ki, bu, bir oyun deyil. Dini nöqteyi-nəzərdən yanaşsaq, bu, naməlum bir Allaha edilmiş qurbandır. (14)

Ədəbiyyat tarixçisi və ədəbi tənqidçi Andres Amorosun zənnincə, korridanı bu oyunun azarkeşlərindən çox heç kəs sevə bilməz: *"Heç kəs korridanın gözəlliyinə onlardan çox valeh ola bilməz, heç kəs korridanı onlardan çox müdafiə edə bilməz və heç kəs korridaya qarşı saxta və ya pis münasibət, nifrət qarşısında onlardan çox hiddətlənə bilməz".* (1, s.164)

Tavromakiya tərəfdarları arasında Nikolas Fernandes de Moratin, Valye-İnklan və başqaları da var.

Öküz döyüşü azarkeşi olan ispan yazıçı və şairlərinin demək olar ki, yaradıcılıqlarının çox hissəsi bu bayrama həsr olunmuşdur. Bayrama həvəs göstərməyənlərdə isə az da olsa, mütləq bu bayramın təsirinə rast gələ bilirik:

Un prodigioso mágico sentido, / un recordar callado en el oído / y un sentir que en mis ojos sin voz veo. / Una sonora soledad lejana, / fuente sin fin de la que insomne mana / la música callada del toreo (Rafael Alberti "La música callada del toreo"). (15)

Öküz döyüşünün mərhələlərini ədəbiyyatdan nümunələr gətirməklə başdan-ayağa nəzmlə təsvir etmək mümkündür. Korridanı açılışında əsas mərhələ hesab olunan təntənəli yürüşü Fransisko Vilyaespesanın şeiri ilə təsəvvür edək: Y cuando las cuadrilla / riman su paso / al son de un

pasodoble, / vivo y sonoro, / alegre como el vino de / Andalucía, cada traje es un iris / de seda y raso, / que a los besos de/ llamas de un sol de oro / se derrite en un iris de / pedrería.

Daha sonra torero korrida prezidentinin icazəsi ilə döyüşə başlayır. Nikolas Fernandes de Moratinin "Vida y Gloria de Pedro Romero" şeirindəki torero Pedro Romero kimi: ¡Con cuánto señorío! / ¡ Qué ademán varonil! ¡Qué gentileza! / Pides la venia, hispano atleta, y sales / En medio, con braveza / Que llaman y alas trompas y timbales.

Ardınca kapote mərhələsi başlayır: El torero acompaña / con el capote al viento / el raudo movimiento/del toro fiel que pasa. (Rafael Alberti "Corrida", 1970)

Öküzün öz bacarığı və vəhşi təbiətini nümayiş etdirdiyi atlı pikadorlarla görüşdən sonra, Manuel Maçadonun "La fiesta nacional" şeiri ilə rəngli banderilyalar arenaya təşrif buyururlar: Por encima / de las astas, que buscan el pecho, / las dos banderillas/milagrosamente/clavando..., se esquiva / ágil, solo, alegre, / sin perder la línea.

Sonda öküzün ölümünü qaçılmaz edən sehrli muleta gəlir: El pase de muleta / es el arco glorioso/que al fin rinde el acoso / que la muerte sujeta. / Y cuando atravesada / siente el toro su vida,/ piensa que la corrida / vale bien una espada. (Rafael Alberti, "Corrida") (17)

Korrida bütün dövrlərdə teatr, nəsr əsərləri və poeziyanın əsas mövzusu olub. Qeyd etməliyik ki, klassik dramaturgiyada korrida mövzusu çoxluq təşkil etməyib. Ramon Mariya del Valye-İnklan qeyd edirdi: *"Teatrımızda korrida rüzgarı əssə idi, möhtəşəm olardı. Zorakı olsa da, öz gözəlliyi ilə tamaşaçılara estetik zövq yaşadan bu bayramı teatra köçürsəydik, İliada kimi qəhrəmanlıq nümunəmiz yaranardı".* (18)

Korrida həvəskarları olmayan Lope de Veqanın "Los Vargas de Castilla" və "El marqués de las Navas" komediyaları, Tirso de Molinanın "La lealtad contra la envidia", Xuan Ruis de Alarkonun "Todo es ventura", Kalderon de la Barkanın "Guárdate del agua mansa", Fransisko Kevedonun "El zurdo alanceador" dram əsərləri bütövlüklə korridaya həsr olunmasa da, bu mövzuda müəyyən səhnələrə rast gəlmək olar. Xasinto Benavente "La sobresaliente", "La gobernadora" komediyalarında, iki qardaş Serafin və Xoakin Alvares Kintero "El traje de luces" və "Palmas y pitos" sonetlərində, Karlos Arniçes "La estrella" sonetində, Federiko Qarsiya Lorka isə "Mariana Pineda" romansında, İqnasio Sançes Mejiyas "Sinrazón", "Zaya" və "Ni más, ni menos" dram əsərlərində korrida mövzusuna müraciət etmişlər. 1975-ci ildə səhnəyə qoyulmuş Xuan Antonio Kastronun "Tauromaquia" əsəri bayramın mifik kökləri, 1982-ci ildə isə Fransisko Nievanın "Coronada y el toro" əsəri bayram və torero haqqında məlumat əldə etmək baxımından çox qiymətlidirlər. (17)

Ədəbiyyat sahəsində isə korrida dünyası haqqında geniş məlumatları Alberto Qonsales Troyanonun 1988-ci ildə nəşr etdirdiyi "El torero, héroe literario" adlı tədqiqat işi vasitəsilə əldə edə bilərik. Burada müəllif müfəssəl şəkildə korrida mövzusu haqqında yazılan bütün romanlar üzərində araşdırma aparmışdır. Fernando de Roxasın "La celestina", Qines Peres de Hitanın "Guerras civiles de Granada", Visente Espinelin "Vida de Marcos de Obregón", Miqel de Servantesin "Don Quijote de la Mancha", Xuan Enrikes de Zunyiqanın "Amor con vista", Benito Peres Qaldosun "Episodios Nacionales", Arturo Reyesin "Cartucherita" əsərləri tamamilə öküz döyüşünə həsr olunmasa da, ya bu bayram haqqında xatırlatmalar, ya da döyüşdən müəyyən epizodlar verilmişdir. Xarici müəlliflərdən Abrantes qrafinyasının "Le toreador", fransız yazıçıları Teófilo Qautierin "La Militone", Sesilia Bohl de Faberin isə "La Gaviota" əsərlərində bu mövzuya rast gələ bilərik. (17) Xuan Qilyen Sotelonun "Un buscador de oro", Eduardo Lopes Baqonun "Luis Martínez, el espada", Visente Blasko Ibanyesin "Sangre y arena", Xuan Lopes Nunyesin "El niño de las monjas", "Currito de la Cruz", Ramon Qomes de la Sernanın "El torero Caracho", Anxel Mariya de Leranın "Los clarines", Xorge Sela Trulokun "Blanquito, peón de brega", Fernando Qinyonesin "La gran temporada", Antonio Burqosun "Tropical Spanish", Rafael Herrero Minqoransenin "De miedo y oro", Kamilo Xose Selanın "Torerías", "El gallego y su cuadrilla", "Toreo de Salón" əsərləri tamamilə bu mövzuya həsr olunmuşdur. Xarici müəlliflərdən isə bu mövzunu əsərinin mərkəzinə çevirən Peter Viertel ("Love Lies Bleeding"), Jan Kau ("Las orejas y el rabo") və Ernest Heminqvey ("Fiesta", "El verano sangriento") olmuşdur. (19) Ernest

